


VI. Sulaşmış neft quyusunun indikator diaqranlarını S-i və n-i dəyişdirmədən çıxarılması üsulunu tətbiq edəndə.
Beləliklə, çoxfunksiyalı tədbirin tətbiqilə baxılan quyuların istismarı göstəriciləri yaxşılaşır və böyük iqtisadi səmərə əldə edilir.
**Açar sözlər:** polifunksional tədbir, sulaşmış quyu, qum təzahürü, korroziya, eroziya, yeyilmə, mürəkkəbləşmə, boruarxası fəza, qumun mayedə konsentrasiyası, bərpa əyrisi.

Məlumdur ki, neft quyularının istismarını həyata keçirəndə çox saylı mürəkkəbləşmələr, nasazlıqlar, qəzalar və digər xoşagəlməz hadisələr baş verirlər. Ştanqlı dərinliknasos neft quyularında da özlərinə məxsus analoji xoşagəlməz hadisələr müşahidə olunurlar və demək olar ki, digər istismar üsulları ilə işləyən quyulara nisbətən tez-tez və çox sayda təzahür edirlər.
Azərbaycanda Abşeron arxipelaqı neft yataqlarında və Xəzər dənizi akvatoriyasının azərbaycan sektorundakı yataqlarda əsasən aşağıdakı mürəkkəbləşmələr baş verirlər:

1) istismar neft quyularının sulaşması;
2) qum təzahürlərinin intinsivləşməsi;
3) qaldırıcı nasos-kompressor boru (NKB) kəmərində parafin kristallarının çökməsi;
4) NKB kəmərində duzların çökməsi;
5) yerüstü quyuağzı və yeraltı avadanlıqların korroziyadan, eroziyadan və sürtünərək yeyilmədən sıradan çıxması və s.

Ümumiyyətlə mürəkkəbləşmələrlə mübarizə üsulllarını iki qrupa bölmək olar:

1. Mürəkkəbləşmələrin baş verməlerinin qarşısını alan, yaxud onların mənfi təsirini azaldan üsullar.
2. Baş vermiş mürəkkəbləşmələrin ləğv edilməsi üsulları.

Bu qrupların hər birində bir neçə müxtəlif üsullar vardır.
Azərbaycanda neftçıxaran mütəxəssislərinin çoxillik təcrübəsindən məlum olmuşdur ki, ən geniş yayılan və neft-qaz hasilatının artırılmasına ən çox zərər vuran mürəkkəbləşmələrin sayı ikidir:

1) neft quyuları məhsullarının sulaşması;
2) qum təzahürlərinin intensivləşməsi.

Ştanqlı dərinliknasos neft quyularının sulaşması nəticəsində aşağıdakı fəsadlar yaranırlar:

- sulaşmış ştanqlı dərinliknasos quyularının istismarı davam etdikcə su debitləri artır, neft debitləri isə azalır, çünki suyun lay şəraitindəki özlülüyü neftinkinə nisbətən bir neçə dəfə aşağı olur; lay suyunun sıxlığı neftinkindən böyük olur; ona görə nefti laydan çıxaran və yer səthinə qaldıran ümumi depressiyanın payı azalır, lay suyuna düşən payı isə artır;
- su debitləri artdıqları üçün quyudibi zonadan qun hissəciklərinin və digər mexaniki qarışıqların xaric edilən miqdarı artır; orada ovudlar əmələ gəlirlər; məhsuldar layın üstündə, yuxarıdakı süxurlar uçulub aşağı tökülürlər və istismar kəmərini deformasiyaya məruz qoyurlar.

Bu formasiyalarının növləri aşağıdakılardır:

2) kəmərin əzilməsi;
3) kəmərin sınması;
4) kəmərin qırılması.

Bunlar əsaslı təmir briqadaları tərəfindən aradan qaldırılırlar:

- sulaşmış quyulardan hasil edilmiş səmt sularının miqdarı çox olur; neft mədənlərinə yaxın ərazilərdə böyük göllər yaradırlar; səmt suları çirkli sulardır, tərkibində duzlar və turşular

olan qumdan (bəzilərində hidrogen-sulfid qazları da olurlar), ətraf mühiti, atmosferi və dənizi zəhərləyirlər, yaşıllığı məhv edirlər və s.;

- səmt suları yerüstü ağız və yeraltı avadanlıqları korroziyaya, eroziyaya məruz qoyurlar, abraziv təsir edərək onları sıradan çıxarırlar.

2012-ci ilədək sulaşmış neft quyularında lay sularını təcrid etmək üçün və ya onların laydan quyuya gəlməsini məhdudlaşdırmaq üçün, layda onların qarşısında xüsusi sutəclidedici kompozisiyalarla bərk baryer yaradılırdı. Bu baryer həm lay sularının, həm də lay neftinin quyuya axmasını qoymurdu. Lay neftinin qarşısında quyudibi süzgəcdə 4-5 dəfə təkrar perforasiya edilirdi, ya zəif neft axını alınırdı, yaxud da alınmırdı və quyudibi süzgəc dağılıb sıradan çıxırdı.

2012-ci ildə [6] qrant layihəsindəki təkliflə laydaki suların qarşısında ölü (qazsız) neftdən maye baryer yaradılmışdır; həm kontur və həm də daban suları universal hidrodinamik üsulla təcrid edilmişdir [7].

Bu məqalədə polifunksional tədbirin tətbiq edilməsilə, sulaşmış ştanqlı dərinlik nasos quyularının istismarı proseslərinin təkmilləşdirilməsi üsullarından ətraflı izahatlar verilmişdir.

Polifunksional tədbir ştanqlı dərinliknasos neft quyularının boruarxası fəzasına mayenin əlavə edilməsinə, yaxud oraya nasos aqreqatı ilə vuralmasına demişik. Ona görə polifunksional demişik ki, bu bir tədbir həyata keçiriləndə müxtəlif tədqiqat üsullarında bir neçə funksiyaları icra edir.

Azərbaycanda 50 ildən çox vaxt keçmişdir ki, dəniz yataqlarının işlənməsinə başlanmışdır (Neft daşlarında).

Bundan qabağki illərdə çoxfunksiyalı adlandırdığımız bu tədbirin birinci funksiyasından istifadə etməyə başlanmışdır və hal-hazırda istifadə etməklə davam edilir.

**Birinci** funksiya yerinə yetiriləndə nələrə nail olunur? Boruarxasına təmiz mayeni əlavə edəndə (özü də sabit sərflə) məhsuldaki mayenin miqdarı artır və qumun (mexaniki qarışıqların) bu mayedəki konsentrasiyası azalır və onların quyudan xaric edilməsin prosesi yaxşılaşır; deməli bu tədbirlə quyunun istismarı yaxşılaşır.

Mancanaq dəzgahının işini dayandırmadan lay təzyiqinin təyin edilməsinin yeni üsulunda polifunkional tədbirin **ikinci** funksiyası yerinə yetirilir. Burada quyu işləyə-işləyə onun boruarxası fəzasınamüəyyən miqdarda təmiz maye əlavə edilir, yaxud aqreqatla vurulur və quyuda maye səviyyəsi özünün statik vəziyyətindən bir neçə metr yuxarı qaldırılır; mayenin əlavə edilmisi dayandırılır və ləngimədən dinamik səviyyənin aşağı düşməsi exometrlə izlənir və bir əyri qurulur – $H^{din} = f(t)$, burada $H^{din}$ – dinamikmaye səviyyəsinin dərinliyi, t – zamandır. Bundan sonra nasosun xarakteristikası – h = f(t) qurulur; bu maili düz xətt şəklində alınır və əyrinin birinci nöqtəsindən çıxır.

Əyriyə nasosun xarakteristikasına paralel bir toxunan düz xətt keçirilir. Toxunma nöqtəsinin ordinatı quyudakı statik maye səviyyəsinin dərinliyini verir; buna əsasən lay təzyiqinin qiyməti hesablanır [1] ( şəkil1).




**Şəkil 1.** İkinci funksiyanın tətbiqi qrafikləri.

Çoxfunksiyalı tədbirin **üçüncü** funksiyası özlü-plastik neft verən ştanqlı dərinliknasos neft quyularında mancanaq dəzgahının işini dayandarmadan lay təzyiqinin, başlanğıc təzyiq düşgüsünün və başlanğıc təzyiq qradiyentinin qiymətləndirini təyin edəndə istifadə olunur. Burada əvvəlcə, birinci üsulda olduğu kimi dinamik maye səviyyəsinin bərpası əyrisi qurulur və nasosun xarakteristikası qurulur. Əyrinin ortasında bir maili düz xətt parçası alınır və onun üç nöqtələrinin ordinatlarına əsasən $P_{lay}$, $\Delta P_o$ və G tapılırlar (şəkil 2).

Çoxfunksiyalı tədbirin **dördüncü** funksiyası ştandlı dərinliknasos neft quyularında lay təzyiqinin təyin edilməsinin ən sadə üsulunda istifada edilmişdir [3, 4].

Bu üsulda ştanqlı dərinliknasos neft quyusunu verdiyi məhsulun hamısı şlanq vasitəsilə özünün boruarxası fəzasına tökülür. Quyunun maye səviyyəsi yuxarıya qalxır; bunun nəticəsində quyudakı maye sütununun hündürlüyü artır, dinamik quyudibi təzyiq artır, quyuya daxil olan maye debiti də azalır. Mədəndə heç bir quyuda qərarlaşmamış axınlarda hidrodinamik tədqiqat üsulu yerinə yetirilib, dib təzyiqinin bərpası əyriləri təqribən bilirlər.




**Şəkil 2.** Üçüncü funksiyanın tətbiqi qrafikləri.

Yuxarıda yazılmış axırıncı tədqiqat üsulunda təzyiqin bərpası vaxtı başa çatan anda, şlanq ayrılır və quyunun bütün məhsulu atqı xəttinə keçirilir və ləngimədən statik səviyyənin dərinliyi exometrlə ölçülür və lay təzyiqinin qiyməti hesablanır (şəkil 3, 4).




**Şəkil 3.** Üsulun tədbiqinin başlanmasınadək mədən tədqiqatlarının nəticələri.




**Şəkil 4.** Üsulun tədbiqinin sonunda mədən tədqiqatlarının nəticələri.

Çoxfunksiyalı tədbirin **beşinci** funksiyası yüksək özlülü nyuton neft və özlü-plastik neft verən ştanqlı dərinliknasos quyularında ikitərəfli bərpə əyrilərinin çıxarılma üsulunda da istifadə edilmişdir. Bu üsulda indiyədək bu əyrilərin birincisinin (aşağıdakını) çıxaranda quyunun (yeni mancanaq dəzgahının işi) dayandırılırdı. [3, 4] işlərdəki üsul kəşf edildikdən sonra, burada da tətbiq edilir və birinci əyri də quyu işləyə-işləyə çıxarılır (şəkil 5, 6, cədvəl.1).




**Şəkil 5.** Özlü-plastik neft verən ştanql dərinliknasos neft quyularında çıxarılmış səviyyənin ikitərəfli bərpa əyriləri.







**Şəkil 6.** Yüksək özlülü nyuton nefti verən ştanql dərinliknasos neft quyularında çıxarılmış səviyyənin ikitərəfli bərpa əyriləri.

**Cədvəl 1.** Qurulmuş əyrilərin cari nöqtələrinin koordinatları

| Скв. 54 | | | | Скв. 423 | | | | Скв. 427 | | | | Скв. 1854 | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| № | Время замера | t, мин | $H^{дин.}$, м | № | Время замера | t, мин | $H^{дин.}$, м | № | Время замера | t, мин | $H^{дин.}$, м | № | Время замера | t, мин | $H^{дин.}$, м |
| 1 | 11:29 | – | 251 | 1 | 11:12 | – | 1312 | 1 | 12:03 | – | 1264 | 1 | 11:18 | – | 478 |
| 2 | 11:45 | 0 | 234 | 2 | 11:13 | 0 | 1286 | 2 | 12:08 | 0 | 1256 | 2 | 11:24 | 0 | 466 |
| 3 | 11:47 | 2 | 233 | 3 | 11:15 | 2 | 1282 | 3 | 12:20 | 12 | 1249 | 3 | 11:30 | 6 | 452 |
| 4 | 11:51 | 6 | 231 | 4 | 11:18 | 5 | 1271 | 4 | 12:30 | 22 | 1234 | 4 | 11:33 | 9 | 451 |
| 5 | 11:55 | 10 | 229 | 5 | 11:25 | 12 | 1252 | 5 | 12:40 | 32 | 1229 | 5 | 11:40 | 16 | 450 |
| 6 | 12:01 | 16 | 228 | 6 | 11:31 | 18 | 1243 | 6 | 12:48 | 40 | 1226 | 6 | 11:44 | 20 | 444 |
| 7 | 12:09 | 24 | 227 | 7 | 11:41 | 28 | 1232 | 7 | 13:01 | 53 | 1221 | 7 | 11:55 | 31 | 442 |
| 8 | 13:03 | 78 | 222 | 8 | 11:47 | 34 | 1223 | 8 | 13:07 | 59 | 1219 | 8 | 12:02 | 38 | 440 |
| 9 | 13:08 | 83 | 219 | 9 | 13:20 | 127 | 1167 | 9 | 13:14 | 66 | 1217 | 9 | 12:03 | 39 | 439 |
| 10 | 13:13 | 88 | 204 | 10 | 13:29 | 136 | 1163 | 10 | 13:20 | 72 | 1216 | 10 | 12:08 | 44 | 437 |
| 11 | 13:17 | 92 | 202 | 11 | 13:58 | 165 | 1154 | 11 | 13:32 | 84 | 1215 | 11 | 12:13 | 49 | 434 |
| 12 | 13:21 | 96 | 199 | 12 | 14:04 | 171 | 1149 | 12 | 13:38 | 90 | 1214 | 1 | 13:19 | 0 | 256 |
| 13 | 13:26 | 101 | 198 | 13 | 14:16 | 183 | 1144 | 13 | 13:43 | 95 | 1210 | 2 | 13:21 | 2 | 259 |
| 14 | 13:29 | 104 | 198 | 14 | 14:27 | 194 | 1139 | 14 | 13:49 | 101 | 1206 | 3 | 13:22 | 3 | 262 |
| 1 | 14:37 | 0 | 9 | 15 | 14:42 | 209 | 1136 | 15 | 13:55 | 107 | 1205 | 4 | 13:23 | 4 | 266 |
| 2 | 14:38 | 1 | 12 | 16 | 14:51 | 218 | 1133 | 1 | 14:32 | 0 | 589 | 5 | 13:24 | 5 | 269 |
| 3 | 14:41 | 4 | 16 | 17 | 14:56 | 223 | 1131 | 2 | 14:33 | 1 | 591 | 6 | 13:27 | 8 | 274 |
| 4 | 14:44 | 7 | 19 | 1 | 15:57 | 0 | 837 | 3 | 14:39 | 7 | 592 | 7 | 13:30 | 11 | 276 |
| 5 | 14:47 | 10 | 22 | 2 | 16:01 | 4 | 844 | 4 | 14:44 | 12 | 593 | 8 | 13:34 | 15 | 278 |
| 6 | 14:51 | 14 | 26 | 3 | 16:07 | 10 | 848 | 5 | 14:49 | 17 | 594 | 9 | 13:39 | 20 | 284 |
| 7 | 14:55 | 18 | 29 | 4 | 16:08 | 11 | 851 | 6 | 15:05 | 33 | 595 | 10 | 13:43 | 24 | 287 |
| 8 | 15:00 | 23 | 39 | 5 | 16:15 | 18 | 853 | 7 | 15:20 | 48 | 596 | 11 | 13:49 | 30 | 289 |
| 9 | 15:04 | 27 | 42 | 6 | 16:21 | 24 | 858 | 8 | 15:29 | 57 | 597 | 12 | 13:51 | 32 | 290 |
| 10 | 15:14 | 37 | 59 | 7 | 16:26 | 29 | 863 | 9 | 15:34 | 62 | 598 | 13 | 13:57 | 38 | 293 |
| 11 | 15:24 | 47 | 72 | 8 | 16:32 | 35 | 866 | 10 | 15:39 | 67 | 599 | 14 | 14:02 | 43 | 294 |
| 12 | 15:32 | 55 | 94 | 9 | 16:37 | 40 | 871 | 11 | 15:51 | 79 | 600 | 15 | 14:06 | 47 | 295 |
| 13 | 15:38 | 61 | 101 | 10 | 16:42 | 45 | 876 | 12 | 15:55 | 83 | 601 | 16 | 14:11 | 52 | 298 |
| 14 | 15:39 | 62 | 102 | 11 | 16:45 | 48 | 878 | 13 | 16:04 | 92 | 602 | 17 | 14:15 | 56 | 299 |
| 15 | 15:45 | 68 | 114 | 12 | 16:50 | 53 | 881 | | | | | 18 | 14:20 | 61 | 300 |
| | | | | | | | | | | | | 19 | 14:26 | 67 | 301 |
| | | | | | | | | | | | | 20 | 14:32 | 73 | 303 |
| | | | | | | | | | | | | 21 | 14:36 | 77 | 304 |
| | | | | | | | | | | | | 22 | 14:41 | 82 | 305 |

Çoxfunksialı tədbirin **altıncı** funksiyası mancanaq dəzgahının ştanqların asqı nöqtəsinin gediş yolu S-i və gedişlərin sayı n-i dəyişdirmədən, quyu işləyə-işləyə iş rejiminin dəyişdirilməsinin yeni üsulundan istifadə ediləndə yerinə yetirilir. Bu üsulun mahiyyəti aşağıdakılardan ibarətdir.

S-i və n-i dəyişdirmək olmaz, biz bundan imtina edirik, çünki onda aşağıdakı fəsadlar yaranır:
- quyunun neft və qaz hasilatı azalır;
- mancanaq dəzgahında ağır detalları olan düyünlərdə sökülmə və quraşdırma işləiri aparıldığı üçün bədbəxt hadisə baş verə bilər;
- düyünlərin detalları yeyilib sıradan çıxa bilər və təmirlərə ehtiyac olar və s.

Təklif edilən yeni üsulda lay təzyiqi yuxarıda qeyd edilmiş ən sadə üsulla təyin edilir; bu indikator diaqramının bir nöqtəsi olur (absıs – dib təzyiqləri oxunda yerləşir).
Quyu işləyə-işləyə onun boruarxası fəzasına onun öz rejimindəki debitinin bir hissəsi qədər sabit sərflə maye əlavə edilir (məsələn 1/3 hissəsi qədər), onda laydan quyuya gələn debit 2/3 hissəsi qədər olur; exometrlə dinamik səviyyə ölçülür və dinamik dib təzyiqi hesablanır. Üçüncü nöqtəni almaq lazım gələndə (əgər indikator diaqramı əyri xətlidirsə), boru arxası fəzaya quyunun öz rejimindəki debitinin başqa hissəsi qədər (məsələn, 2/3-i qədər) maye sabit sırflə əlavə edilir, bu zaman laydan gələn debit 1/3 hissəsi qədər olur; səviyyə ölçülür və diaqramın üçüncü nöqtəsi qurulur.
Əgər ştanqlı dərinliknasos neft quyusunun məhsulu sulaşmışdırsa, onda həm neft üçün həm də su üçün debitlərin hissələri qədər mayelər boruarxası fəzaya tökülürlər (şəkil 7).
Çoxfunksiyalı tədbirin bütün bu beş funksiyalarını tədqiqat işlərində istifadə etdikdə istismar proseslərinin aparılmasında əhəmiyyətli dərəcədə iqtisadi səmərə əldə etmək mümkündür.
Şəkil 8-də quyu № 183-ün indikator diaqramlar göstərilmişdir.




**Şəkil 7.** Ölü nefti laya vurduqdan sonra quyunun təkrar sulaşması müddətinin hesablanması üçün yatağın sxemi.




**Şəkil 8.** Quyu № 183-ün indikator diaqramları: 1, 2 – su üçün, 3, 4 – neft üçün

**Nəticələr:** 1. Məqalədə Azərbaycanda Abşeron arxipelaqı neft yataqlarında və Xəzər dənizi arvatoriyasının azərbaycan sektorunda baş verən mürəkkəbləşmələrin haqqında ətraflı məlumatlar verilmişdir.
2. Göstərilmişdir ki, ən çox və tez-tez baş verən mürəkkəbləşmələr ştanqlı nasos quyuları məhsulunun vaxtəndan qabaq sulaşmasıdır və qum təzahürlərinin intensivləşməsidir.
3. Polifunksional tədbirin altı funksiyasının istifadə edilməsi işıqlandırılmasıdır və onların mahiyyətləri izah edilmişdir.
4. Bu tədbirin aşağıdakı məqsədlərlə istifadə edilməsi göstərilmişdir: quyularda maye məhsulundakı qum hissəciklərinin yaxşılaşdırma; mancanaq dəzgahının işini dayandırmadan lay təzyiqin qiymətinin təyin edilməsi, quyunun iş rejiminin yeni dəyişdirilməsi.
5. Sulaşmış ştanqlı dərinliknasos neft quyularının istismar parametrlərinin bu tədbirin tədbiqilə təyin edilməsi təklif edilmişdir.

**ƏDƏBİYYAT**

1. Мустафаев С.Д. Новый способ определения пластового давления в глубинно-насосных скважинах. НХ, № 8, 1968, с.6.
2. Самедов Т.А., Мустафаев С.Д. и др. Определение статического давления пластов, содержащих высоковязкие ньютоновские и вязкопластичные нефти методом двух-стороннего восстановления давления. Москва. Нефтепромысловое дело. ВНИИОНГ, № 12, 2016, с.41-46.
3. Мустафаев С.Д., Кулиев Р.А., Ханалиев В.Г. Новый способ определения пласто-вого давления в штанговых глубинонасосных скважинах. Булатовские чтения. Материалы IV международной научно-практической конференции. (31 марта 2020). Сборник статей. Том 2. Раработка нефтяных и газовых месторождений. С. 337-343.

4. Мустафаев С.Д., Кулиев Р.А., Ханалиев В.Г. Новый способ определения пластового давления в штанговых глубинонасосных скважинах. Междунаодный научно-исследовательский журнал. № 2 (92). 2020. Часть 1, февраль. С.91-104.
5. Гумбатов Г.Г., Дащдиев Р.А. Химические реагенты, применяемые при добыче, подготовке нефти и газа. Справочник. Том 2. Баку: Елм. 1999. 376 с.
6. Quliyev R.A. Kontur suyu ilə sulaşmış neft quyularında faza keçiriciliklərinin təyini. EKO ENERGETİKA elmi-texniki jurnal. № 8, 2012, c.63-67 İSSN-1816-2126.
7. Quliyev R.A. Sulaşmış neft quyularında süxurların neftə və suya görə faza keçiriciliklərinin təyini. ANT, № 4, 2013, c. 52-55.

Bu iş Azərbaycan Respublikasının Prezidenti yanında Elmi İnkişaf Fondunun maliyə dəstəki ilə yerinə yetirilmişdir. Qrant № EİF/MQM/ Elm-Təhsil-1-2016-1 (26)-71/01/2.

# IMPROVEMENT OF THE OPERATION PROCESS OF WATERED DEEP OIL PUMP WELLS BY APPLICATION OF POLYFUNCTIONAL MEASURES

**[1]Vaqif Gurbanov, [2]Safa Mustafayev, [3]Zuleykha Eyvazova, [4]Farhad Bayramov, [5]Nariman Mustafayev**

[1]Deputy Director for Scientific Affairs, ANAS Institute of Oil and Gas, doctor of sciences, Azerbaijan. E-mail: vaqifqurbanov@mail.ru.

[2]Dosent, "Industrial machines" department, Azerbaijan State Oil and Industry University, PhD in Technical Sciences,Azerbaijan. E-mail: safa_mustafaev@mail.ru.

[3]Dosent, "Industrial machines" department, Azerbaijan State Oil and Industry University, PhD in Technical Sciences, Azerbaijan. E-mail:eyvazovaze@mail.ru. https://orcid.org/0000-0002-1239-4567

[4]Dosent, "Industrial machines" department, Azerbaijan State Oil and Industry University, PhD in Technical Sciences, Azerbaijan. E-mail: farxadbayram@mail.ru.

## ABSTRACT

The article shows the types of complications that occur mainly in the fields of the Absheron archipelago in Azerbaijan and in the oil fields of the Azerbaijani sector of the Caspian Sea; the most common and frequent of them are the watering of the production of sucker rod pumping wells and the intensity of sand manifestations.
It is noted that methods that prevent complications or reduce their negative impact are more appropriate than methods for their elimination.
It is proposed to isolate formation water in flooded sucker-rod pumping oil wells using a universal hydrodynamic method; In this method, a liquid barrier should be created in front of the water in the formation, and not a solid barrier, and high-viscosity dead (non-gaseous) oil




should be taken as a separating fluid, the specific gravity of which should be equal to the specific gravity of the formation water.

The article uses the following five functions of multifunctional measures when carrying out various well survey methods:

I. Pouring clean fluid into the annulus to increase the amount of fluid in the wellbore and reduce the concentration of sand particles in it.

II. Without stopping the operation of the pumping unit, adding clean oil to the annulus with the help of a unit, raise its static level several meters higher.

III. Determination of values of $P_k$, $\Delta P_o$ and G in rod deep well pumping wells producing viscous-plastic oil without stopping the operation of the pumping unit.

IV. To determine the reservoir pressure in the simplest way, all well production is drained with a hose into the annulus.

V. When removing the first lower curve by the method of two-sided restoration of curves without stopping the operation of the pumping unit

VI. When applying the extraction method without changing the indicator diagrams S and n of water-cut oil wells.

Thus, the use of multifunctional measures improves the performance of the considered wells and provides great economic benefits.

**Keywords:** polyfunctional measure, irrigated well, sand manifestation, corrosion, erosion, wear, complication, pipe space, sand concentration in liquid, recovery curve.

# ПОВЫШЕНИЕ ПРОЧНОСТНЫХ ХАРАКТЕРИСТИК УПЛОТНИТЕЛЬНЫХ ЭЛЕМЕНТОВ ПАКЕРОВ, ИЗГОТОВЛЕННЫХ ИЗ ПОЛИМЕРНЫХ НАНОКОМПОЗИТОВ

**Арзу Сулейманова**

Старший лаборант, диссертант, Азербайджанский Государственный Университет Нефти и Промышленности, кафедра "Промышленные машины", Азербайджан. E-mail: ar.suleymanova@mail.ru.
https://orcid.org/0000-0002-9936-7608

## РЕЗЮМЕ

На основе микромеханической модели прочности на растяжение полимерного композита показано, что в отличие от случая адгезии между двумя полимерами, когда наблюдается линейная корреляция между толщиной межфазной области и уровнем межфазной адгезии, прочность межфазной границы в нанокомпозитах типа «полимер-высокомодульный наполнитель» снижается по мере роста ее толщины. Установлена зависимость прочности на растяжение полимерных нанокомпозитов от свойств материала и уровня межфазного взаимодействия.
**Ключевые слова:** модель прочности, межфазовая адгезия, нанокомпозит, материал для уплотнения, пакер.

**Актуальность темы**: Пакеры, по функциональному назначению, являются скважинными уплотнителями и их классическое назначение – разобщение пласта с затрубным пространством или двух пластов между собой. Пакеры применяют в обсадных колоннах нефтяных, газовых и нагнетательных скважин при их эксплуатации и ремонте. Часто они применяются для герметизации нарушенных участков обсадной колонны и зон затрубного пространства, расположенных выше и ниже пакеров.
Пакер эксплуатируется в жестких условиях, включая перепады давления в интервале от 7 до 70 МПа, температурных изменений от 40 до 100°C, а при тепловом воздействии на пласт последнее достигает в некоторых случаях 300…400°C.
В конструкциях нефтяных скважинных пакеров в качестве уплотняющего элемента используются резины различных марок, композиционные материалы и др. [1, 2]. К ним, помимо повышенных физико-механических свойств, также предъявляется обеспечение высокой эластичности. Последние годы, при выборе уплотнительного материала для пакеров используются композиционные материалы с нанонаполнителями.
Известно [3, 4, 5], что определяющую роль в формировании свойств полимерных нанокомпозитов играют межфазные слои. Они служат армирующим элементом структуры полимерных нанокомопозитов наряду с нанонаполнителем. С учетом этого факта, межфазные области приобретают особое значение при формировании структурных свойств полимерных композитов. Принципиально важным в случае полимерных нанокомпозитов представляется исследование размерного эффекта наполнителя и размерных характеристик межфазного слоя, что необходимо для количественного определения одного их важных показателей полимерных композитов – степени их




усиления [6]. В ходе технологических процессов приготовления дисперсно-наполненных полимерных композитов всегда происходит агрегация частиц исходного наполнителя (нанонаполнителя) в более или менее крупные агрегаты. Агрегация играет важную роль в формировании микроскопических свойств композитов. В среде полимерных матриц процесс агрегации влияет также и на макроскопические свойства композитов, наиболее важными из которых являются упругость и прочность, характеризуемые модулем упругости и напряжением разрушения.

**Целью работы** является исследование зависимости прочности межфазного слоя от его структурных характеристик композиционного материала с полимерной матрицей и высокомодульной наночастицей.

**Выбор материала и методы исследования:** В качестве материала был выбран композит, в рецептурный состав которого входят следующие компоненты: матрицу композиционного материала составляет бутадиен-нитрильный каучук (БНК), а наполнителем – наномедь, с размерами 40-80 нм. При этом для улучшения литьевых свойств, т.е. для обеспечения хорошей вязкости, пластичности и формуемости в состав композита был включен ряд пластификаторов, растворитель и др. (см.таблица 1).

**Таблица 1.** Состав композита, для изготовления уплотнительного элемента пакера

| Наименование элементов состава композита | Содержание элементов в составе, % | | | |
|---|---|---|---|---|
| | I | II | III | IV |
| Бутадиен-нитрильный каучука (БНКС-28) | 90 | 83 | 100 | 100 |
| Наномедь-напольнитель* | 0,5<br>60 | 1,0<br>60 | 1,5<br>60 | 2,5<br>60 |
| ПЭПА | 2 | 3 | 5 | 10 |
| Глицерин | 1,0 | 1,5 | 2,0 | 2,5 |
| сера | 0,5 | 1,0 | 1,5 | 2,0 |
| Альтакс | 1,0 | | | |
| Каптакс | 1,5 | | | |
| Стеарин | 1,0 | | | |
| Технический графит.0,5-2 | 3,0 | 5,0 | 10 | 12 |
| пластификатора включен ПЭФ-1, 0-20 | 3,0 | 5,0 | 15 | 20 |

*в числителе содержание наночастицы, %; в знаменателе размер наномеди в нм.

Здесь бутадиен-нитрильный каучук (БНКС-28) выполняет функцию матрицы композита, наномедь является наполнителем, причем в составе каждого образца размер наночастицы, соответственно изменялся: I-40 нм; II-50 нм; III-60 нм и IV-80 нм. Кроме этого, в состав композита в качестве пластификатора включен ПЭФ-1, глицерин как диспергирующий агент, сера – вулканизирующие элемент, а также стеарин, альтакс и каптакс для ускорения процесса вулканизации.

Композит изготавливался на лабораторных вальцах ЛБ 320 160/160 в течение 30 мин. Стандартные образцы для физико-механических испытаний вулканизовали при температуре 143$^{o}$C в течение 40 мин.

**Зависимость прочности на растяжение полимерных нано-композитов от свойств материала и уровня межфазного взаимодействия**: Для расчета зависимости прочности межфазной области от расстояния между наполнителем и полимерной матрицей в [7] введен параметр $Z$, зависящий от свойств материала и межфазных слоев. Сущность работы [7] заключается в следующем. Пусть межфазная область состоит из $n$ слоев, каждый из которых имеет разные свойства. Предположим, что каждый межфазный слой имеет одну и ту же толщину, $t_k = \frac{t}{n}, (k = 1, \ldots, n)$, где $t$ – общая толщина межфазной области. Пусть переменная $x$ изменяется от поверхности наночастицы ($x = 0$) до поверхности полимерной матрицы ($x = t$). Тогда для центральной точки $k$-слоя переменная $x$ примет значение $x_k = k \cdot t_k - \frac{t_k}{2}$. Прочность на растяжение межфазных слоев подчиняется степенной зависимости от $x_k$ [8]:

$$\sigma_k = \sigma_p - \left(\sigma_p - \sigma_м\right)\left(\frac{x_k}{t}\right)^Z, \tag{1}$$

где $\sigma_м$ и $\sigma_p$ – прочность на растяжение матрицы и наночастиц, соответственно; $Z$ – межфазный параметр, регулирующий свойства межфазных взаимодействий.
Уравнение (1) выполняется для всех полимерных нанокомпозитов, содержащих хорошо диспергированные наночастицы. Средняя прочность на растяжение межфазной границы $\sigma_i$ может рассматриваться как прочность на растяжение центрального межфазного слоя, т.е. слоя $\sigma_k$ с $x_k$ равным $t/2$. Соответственным образом $\sigma_i$ определяется как

$$\sigma_i = \sigma_p - \left(\sigma_p - \sigma_м\right) \cdot \left(0,5\right)^Z, \tag{2}$$

Сопоставляя (2) с уравнением (1), можно получить для $Z$ следующее выражение

$$Z = -1,44 \cdot \ln\left(\frac{\sigma_p - \sigma_i}{\sigma_p - \sigma_м}\right). \tag{3}$$

С учетом уравнения (2.6) величину $\sigma_i$ можно выразить как:

$$\sigma_i = \sigma_м \cdot \exp\left(\frac{B}{1 + A_н \cdot \rho_н \cdot t}\right). \tag{4}$$

Подставляя (4) в уравнение (3), получим выражение

$$Z = -1,44 \cdot \ln\left[\frac{\sigma_p - \sigma_м \cdot \exp\left(\frac{B}{1 + A_н \cdot \rho_н \cdot t}\right)}{\sigma_p - \sigma_м}\right], \tag{5}$$




которое связывает параметр $Z$ с характеристиками материала и межфазных взаимодействий (межфазных слоев). Для сферических наночастиц $A_н$ определяется в виде

$$A_н = \frac{A}{m} = \frac{A}{\rho_н v} = \frac{4\pi r^2}{\rho_н \cdot \frac{4}{2}\pi r^3} = \frac{3}{\rho_н \cdot r}, \tag{6}$$

где $A$, $m$, $v$, $r$ – площадь поверхности, масса, объем и радиус наночастиц, соответственно.
Подставляя (6) в уравнение (5), получим следующее выражение для $Z$:

$$Z = -1,44 \cdot \ln \left[ \frac{\sigma_p - \sigma_м \cdot \exp\left( \frac{B}{1 + 3\frac{t}{r}} \right)}{\sigma_p - \sigma_м} \right]. \tag{7}$$

В условиях агрегации частиц наполнителя зависимость фрактальной размерности $d_н$ поверхности частиц наполнителя от параметра агрегации $k(r)$ представляется формулой [9]

$$d_н = d + \frac{1}{\lg\left(\frac{D_p}{2}\right)} \left[ \lg k(r) + \lg \frac{10^3}{7,5 \cdot 410} \right] \tag{8}$$

Для рассматриваемого нами композита при фиксированных значениях $D_k$ и $D_r$, равных 2,43 и 60 нм, соответственно, с учетом выражения для $k(r)$ [9]:

$$k(r) = \frac{7,5 \cdot 6 \cdot 10^3}{\rho_{dens} \cdot D_p} \left( \frac{D_p}{a} \right)^{d - D_k},$$

где для меди $\rho_{dens}$ и $a$ равны 8930 кг/м$^3$ и 14 нм, соответственно, из (8) получим, что $d_н$ не превышает 2,18 при значении $k(r)$, не превышающем 0,18·10$^{-3}$. На основании формулы для $l_{мф}$ [10]:

$$l_{мф} \approx a \left( \frac{R_r}{a} \right)^{2(d - d_н)} \tag{9}$$

где $a$ – минимальный линейный масштаб, на котором возможно проявление фрактального поведения (для полимеров он принимается равным длине статистического

сегмента макромолекулы полимерной матрицы); $R_r$ – радиус частиц. С учетом (9) находим

$$\frac{t}{r} \approx a^{1-2(d-d_н)} \cdot r^{2(d-d_н)-1} \approx 14^{1-2(d-d_н)} \cdot r^{0,6}$$

Отсюда следует, что $\frac{t}{r}$ убывает с уменьшением $r$. Тогда из формулы (7) находим, что параметр $Z$ возрастает с убыванием $r$, что влечет за собой в силу формулы (2) возрастание прочности межфазной области $\sigma_i$.

Таким образом, можно сделать следующие выводы.

**Выводы:** - прочность межфазной границы в основном зависит от двух параметров: объемных долей кластеров и наполнителя. В работе, для рассматриваемого полимерного композита, даны оценки критических значений этих параметров, играющих роль порогов степени переноса механического напряжения от полимерной матрицы к наполнителю, переход через которые (влево для нанокластеров и вправо для наполнителя) ведет к ослаблению указанного переноса.

- показано, что определяющий уровень межфазного взаимодействия безразмерный параметр, входящий в микромеханическую модель прочности композита, будет уменьшаться при превышении порога объемной доли наполнителя и становиться отрицательным. В этом случае межфазная граница теряет способность переносить напряжение от полимерной матрицы к наполнителю. Более того, реализуется механизм формирования критического структурного дефекта, приводящего к разрушению межфазной границы композита. При этом наполнитель утрачивает функцию усиления прочности композита.

**ЛИТЕРАТУРА**

1. Каталог «Пакерно-якорное и подземное оборудование». Тюмень, Югсон-сервис. 2012. 76.
2. Əliyev V.İ. Neft-qaz quyularının qazılması və istismarında endirmə-qaldırma avadanlıqları kompleksi. Bakı: ADNA mətbəəsi, 2011, 404 s.
3. Смирнов В.А. Размерные эффекты и топологические особенности наномодифицированных композитов /В.А.Смирнов, Е.В.Королев, Н.И.Альбакасов //Нанотехнологии в строительстве. 2011. №4. С.17-27.
4. Полимерные нанокомпозиты: многообразие структурных форм и приложений /А.К.Макитаев, Г.В.Козлов, Г.Е.Заиков. М.: Наука. 2009.278с.
5. Козлов Г.В., Яновский Ю.Г., Яхьяева Х.Ш., Магомедов Г.М. Слоевая структура межфазных областей в полимерных композитах и нанокомпозитах //Нанотехнологии в строительстве. 2012. №4. С.28-34.
6. Козлов Г.В. Структура и свойства дисперсно-наполненных полимерных нанокомпозитов //Успехи физических наук, 2015, т.185. №1. С.35-64.




7. Zare Yu., Rhee K.Y. Dependence of Z Parameter for Tensile Strength of Multi-Layered Interphase in Polymer Nanocomposites to Material and Interphase Properties //Nanoscale Research Letters (2017), 12-42.
8. Zare Yu., Rhee K.Y. Modeling approach for tensile strength of interphase layers in polymer nanocomposites //Journal of Colloid and Interface Science 471 (2016) 89-93.
9. Дышин О.А., Габибов И.А., Рустамова К.Б. Свойства структуры дисперсно-наполненных металлополимерных композитов // Вестник Пермского национального исследовательского политехнического университета. Механика. – 2018. - №2. С.24-31.
10. Козлов Г.В., Яновский Ю.Г., Карнет Ю.Р. Структура и свойства дисперсно-наполненных полимерных композитов: фрактальный анализ. М.: Альянстрансатом. 2008. 363с.

# IMPROVING THE STRENGTH CHARACTERISTICS OF PACKERS' SEALING ELEMENTS MADE OF POLYMER NANOCOMPOSITES.

**Arzu Süleymanova**

Senior laboratory assistant, “Industrial machines” department, dissertant, Azerbaijan State Oil and Industry University, Azerbaijan. E-mail: ar.suleymanova@mail.ru. https://orcid.org/0000-0002-9936-7608

## ABSTRACT

On the basis of a micromechanical model of the tensile strength of a polymer composite, it is shown that, in contrast to the case of adhesion between two polymers, when there is a linear correlation between the thickness of the interfacial region and the level of interfacial adhesion, the strength of the interface in nanocomposites of the "polymer-high modulus filler" type decreases with growth. its thickness. The dependence of the tensile strength of polymer nano-composites on the properties of the material and the level of interfacial interaction has been established.

**Keywords**: strength model, interfacial adhesion, nanocomposite, seal material, packer.

# BORU KƏMƏRLƏRİNİN KORROZİYADAN MÜHAFİZƏSİ ÜÇÜN POLİMER ƏSASLI NANOKOMPOZİSİYA MATERİALARI

**Könül Rüstəmova**

Mühəndis, "Neftin, qazın geotexnoloji problemləri və kimya" ETİ, Azərbaycan. E-mail: konul-ayan@mail.ru

## XÜLASƏ

Mədənlərarası boru kəmərlərinin korroziyada mühafizəsi məqsədi ilə polimer örtük materiallarından istifadə edilir. Təqdim olunan məqalədə boru kəmərlərinin korroziyadan mühafizəsi üçün yeni tərkibli polimer əsaslı nanokompozit materiaları təklif edilmişdir.
**Açar sözlər.** Polimer əsaslı örtük materialı, nanodoldurucu, şişmə əmsalı.

**Mövzunun aktuallığı**: Neftqazmədən avadanlıqlarının (NQMA) etibarlı iş rejiminin təminində qəbul olunan tədbirlər sırasında polimer örtük materiallarından (PÖM) istifadə mühüm yer tutur [1,2,3,4]. Bununla yanaşı qeyd etmək lazımdır ki, PÖM-dən hazırlanan konstruksiyalar yüksək aqressivliyi ilə seçilən neft, qaz və mədən suları, eləcə də onların qarışığı mühitində digər materiallarından fərqlənirlər. Bu fərqləndirici cəhət sırasında onların emalı və tətbiqində baş verən strukturlaşma, metal səthə çəkilən qatın en və uzunluqları boyunca formalaşan xassələrinin qeyri-bərabər paylanması, temperatur dəyişmələri nəticəsində materialın tərkibindəki həlledici qalıqlarının və qaz faktorunun xaotik ayrılması, adqeziya və kogeziya proseslərinin müxtəlifliyini və digərlərini göstərmək olar.
PÖM-də tələb olunan qalınlığı təmin etmək məqsədi ilə çox vaxt onun metal səthə bir neçə dəfə çəkilməsi tələb olunur. Bu isə öz növbəsində çox təbəqəli konstruksiyanın əmələ gəlməsinə səbəb olur. Metal+polimer və polimer+polimer qatları arasında baş verən yığışma (metal və polimer materiallarda xətti genişlənmə əmsallarının müxtəlifliyi səbəbindən) və termiki proseslər (örtük materialının tərkibindəki həlledici və qaz faktorlarının ayrılması) nəticəsində konstruksiyada daxili gərginliklərin yaranmasına, ümumilikdə etibarlığın və uzun ömürlüyün azalmasına səbəb olur.
Göstərilənlərlə yanaşı plastik kütlələrdə və polimer əsaslı kompozisiya materiallarda miqyas faktoru, atmosfer və mövsüm dəyişmələri də konstruksiyanın resursuna ciddi təsir edir.
Problemin həlli ilə bağlı mövcud ədəbiyyatların, texniki və texnoloji reqlamentlərin, eləcə də ETİ-də verilən tövsiyələrin təhlili onların qənaətbəxş və birmənalı olmadığını təsdiqləyir. Xüsusi ilə PÖM ilə təchiz olunmuş konstruksiyalarda möhkəmlik və uzunömürlüyün qiymətləndirilməsində, istismar mühitində baş verən kimyəvi təsirdən fiziki-mexaniki xassələrin dəyişməsini nəzərə alan riyazi ifadə və modellərin olmaması problemin həllinin mürəkkəbləşməsinə əsas yaradır.
Göstərilənlərin nəzərə alınmadığı bir şəraitdə polimer materiallardan istifadə olunan konstruksiyalarda möhkəmlik və etibarlılıqla bağlı klassik nəzəriyələrə əsaslanaraq aparılan hesabatlarlrın birmənalı adekvatlığı korrekt hesab edilə bilməz.
Beləliklə, neftqazmədən avadanlıqlarının quruluşlarında polimer və onların əsasında yaradılan kompozisiya materiallarının (PKM) tətbiqi istiqamətində aparılmış araşdırmalar nəticəsində bir-biri ilə ciddi əlaqədə olan iki məsələnin həllini tələb edir:




-istismar mühitini nəzərə almaqla yüksək işqabiliyyəti və uzunömürlük təmin edən material seçiminin düzgün aparılması;
-PÖM ilə təchiz olunmuş konstruksiyada istismar müddətinin etibarlı proqnozunu təmin edən riyazi modelin işlənməsi.

**İşin məqsədi**: Neftqazmədən avadanlıqları, eləcə də, boru kəmərləri sistemində mühitin təsirindən baş verə biləcək imtinaların aradan qaldırılması üçün təklif olunan PÖM-nın istismar prosesində möhkəmliyinin qiymətləndirilməsinin tövsiyələrin işlənməsidir.

**İstifadə olunan materiallar və metodiki baza:** Tədqiqat işində boru kəmərlərinin korroziyadan mühafizəsi üçün cədvəl 1-də göstərilən kompozisiya meterialından istifadə olunmuşdur.
SInaq mühiti qismində distillə edilmis su, neft, müxtəlif tərkibli neft emulsiyaları və məhsulları (benzin, kerosin), eləcə də, dəniz və mədən sularının təsiri şəraiti qəbul olunmuşdur. PKM-nın aqressiv mühitdə davamlılığının qiymətləndirilməsi məqsədi ilə onlarda şişmə əmsalının (λ) dəyişməsi tədqiq olunmuşdur: $\lambda = \frac{Q_t - Q_0}{Q_0} \cdot 100\%$. Burada λ–şişmə əmsalı;$Q_t$-aqressiv mühitdə sınaqlara uğradılmış nümunənin çəkisi, qr. $Q_o$ - sınaq nümunəsinin başlanğıc çəkisi, qr.

**Cədvəl 1.** Polimer örtük materialının tərkib göstəriciləri

| Materialın qrupu | Polimer örtük materialının tərkib göstəriciləri, %-lə | | | |
|---|---|---|---|---|
| | Matrisa | Həlledici | Doldurucu | |
| K-1 | Epoksid qətranı (EQ) + Butadiennitrilkauçuk (BNK) | | Qrafit (5-12)% | Nanomis (1-2)% |
| K-2 | Epoksid qətranı (EQ) + Fenolformaldehid oliqomeri (FFO) | | Mislənmiş qrafit* (80%Cu + 20%C) | |
| K-3 | Epoksid qətranı (EQ) | | Qrafit (5-12)% | Mis (3-5)% |

**Alınmış nəticələr və onların müzakirəsi**: Alınmış nəticələrin təhlili nəticəsində müəyyən edilmişdir ki, matrisası epoksid qətranı və butadiennitril kauçuk olan PÖM-dən hazırlanmış nümunələr bütün hallarda mühitin təsirinə yüksək davamlılıq göstərir. İfrat şişmə prosesi mədən suları (λ=2,51-3,56%) və neft emulsiyalarında (λ=2,29-2,85%) baş verir. Ən aşağı göstəricilər (yüksək şişmə əmsalı) misləniş qrafitlə doldurulmuş epoksid qətranı əsaslı kompozisiya materialında müşahidə olunmuşdur. Burada şişmə əmsalının dəyişmə intervalı (λ=4,34-5,12%) olmuşdur.
Nümunələrdə fiziki-mexaniki göstəricilərin qiymətləndirilmsi ilə bağlı sınaq işlərinin nəticəsi olaraq müəyyən edilmişdir ki, möhkəmlik (dartılmada) həddi və elastiklik modulu mühit dəyişmələrindən asılı olaraq azalırlar.
Şəkil 1-də tədqiqat məqsədi ilə seçilmiş PÖM-nın elastiqiyyət modulunun (*E*) şişmə əmsalından (λ) asılı olaraq mədən suyu (qrafiki əyrilər 1, 2 və 3) və neft emulsiyasının (qrafiki əyrilər $1^1$, $2^1$və $3^1$ ) təsiri şəraitində dəyişmə xarakterləri göstərilmişdir.
Qrafikdəki əyrilərin təhlilindən aydın görünür ki, mühit dəyişmələri, yəni kimyəvi tərkibin dəyişməsi, bütün hallarda PÖM-nın keyfiyyətinə təsir edərək onlarda elastiklik modulu və sıxlıq göstəricilərini dəyişdirir. Təcrübə sınaq işlərinin nəticəsi olaraq müəyyən ediləşdir ki,

mədən suları mühitində örtük materiallarında elastiqiyyət modulu 9,42-12,96% intervalında azalır və dəyişmə *E*(λ)= *a exp (β λ)* uyğundur. Neft mühitində isə *E*(λ) azalma cüzi eksponensal xarakter daşıyaraq 3,05-4.56% sərhədlərində dəyişir. Müəyyən olunmuşdur ki, tədqiq olunan materiallar üçün Puasson əmsalı μ(λ) = 3,12-5,08 % intervalında dəyişir.
Beləliklə, qeyd etmək vacibdir ki, aqressiv mühitdə işləyən PÖM-da deformasiya təkcə mexaniki təsir nəticəsində deyil, eyni zamanda kimyəvi təsirdən materialda baş verən struktur dəyişmələrin hesabına yaranır.




**Şəkil 1.** Polimer örtük materiallarının elastiqiyyət modulunun (*E*) şişmə əmsalından (λ) asılılığı: 1, 2 və 3 - neft emulsiyası mühitində; $1^1$, $2^1$ və $3^1$ - mədən suyu mühitində

Şəkil 2-də örtük materiallarının hazırlanmasında onların tərkibinə əlavə edilən doldurucuların ölçülərinin nümunələrin möhkəmlik həddinə olan təsiri əks olunmuşdur.




**Şəkil 2.** Kompozisiya materialının tərkibindəki doldurucunun ölçülərinin xassələrə təsiri: 1, $1^1$ – kompozisiya materiaı-1; 2, $2^1$ kompozisiya materiaı-2 və 3, $3^1$- kompozisiya materia К-3.

Mədən sınaqlarının nəticələri cədvəl 2-də verilmişdir. Cədvəlin təhlilindən göründüyü kimi, sınaqlara uğradılan örtük materialları sırasında epoksid qətranı və butadiennitril kauçuk əsaslı PÖM bütün hallarda mühitin təsirinə yükcək davamlılıq göstərir.

**Cədvəl 2.** Mədən sınaqlarının nəticələri

| Borunun İstismar şəraiti | Materialın qrupu | İstimar müddəti, il | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | 0,5 | 1,0 | 1,5 | 2,0 | 2,5 | 3,0 | 3,5 |
| Yer səthindən 0,3 m hündürlükdə | I | * | * | * | * | * | * | ** |
| Yer səthindən 0,3 m dərinlikdə | | * | * | * | * | ** | ** | ** |
| Yer səthindən 0,5 m hündürlükdə | II | * | * | * | ** | ** | ** | ** |
| Yer səthindən 0,5 m dərinlikdə | | * | * | ** | ** | ** | *** | *** |
| Yer səthindən 1,0 m hündürlükdə | III | * | ** | ** | ** | *** | *** | *** |
| Yer səthindən 1,0 m dərinlikdə | | * | * | ** | *** | *** | *** | *** |

Qeyd: * - örtük qatı bütövdür; ** - örtük qatında müəyyən fasilələrlə kiçik qabarmalar şəilkində müşahidə olunur; *** - örtülmüş səthlərdə qabarmalar və qopmalar müşahidə olunur.

Cədvəl 2-nin təhlilindən göründüyü kimi boru kəmərində yer səthinə nəzərən yerləşməsindən asılı olaraq korroziya prosesləri dəyişkən xarakter daşıyırlar. İlkin olaraq qeyd etmək lazımdır ki, torpar altında yeerləşən borularda korroziyanın sürəti yer səthinin üzərində yerləşən borulara nəzərən yeksəkdir. Digər tərəfdən müəyyən edilmişdir ki,boru kəmərlərinin yerləşmə dərinliyi (hündürlüyü) artdıqca korroziyadan yaranan fəsadların intensivliyi artır.

Şəkil 3-də 3D modelində hər üç kompozisiya materialında formalaşan xassələrin dəyişmə qanunauyğunluqları göstərilmişdir.




**Şəkil 3.** 3D modelində hər üç kompozisiya materialında formalaşan xassələrin dəyişmə qanunauyğunluqları: a) K-1; b) K-2; c) K-3.

Qrafiklərin təhlilindən göründüyü kimi hər üç kompozisya materialı mühit dəyişmələri şişmə əmsalının ($\lambda$) dəyişməsinə və buna uyğun olaraq sınaqlara uğradılan materialın fiziki-mexaniki xassələrinə ($\sigma$) və ($HB$) ciddi təsir edir. Bundan əalavə kompozisiya materialının tərkibibə əlavə edilən doldurucnun ölçülərinin artması (60, 80, 100, 150 və 200 nm) şişmə əmasının dəyişmə diapozonuna ($\lambda$ = 2,11- 6,05 %), möhkəmlik xarakteristikasının ($\sigma$ = 55- 88 MPa) və bərkliyin ($HB_{200}$ = 13-30 MPa) aşağı düşməsi ilə dəyişir.

Cədvəl 3 və 4-də uyğun olaraq neft və neft emulsiyası (neft+su) mühiti şəraitində sınaqlara uğradılmış nümunələrdə yuxarıda qeyd edilən dəyişmələri əks etdirən göstəricilər verilmişdir. Beləliklə, neftqazmədən şəraitində istismar olunan və mədənlərarası boru kəmərlərinin, eləcə də digər texniki vasitələrin korroziyadan mühafizəsi üçün təkil olunan yeni tərkibli polimer materialların fiziki-mexaniki göstəricilərin qiymətləndirilməsi ilə bağlı aparılmış tədqiqatların nəticəsi olaraq aşağıdakıları qeyd etmək olar:

- neftqazmədən avadanlıqlarının və boru kəmərlərinin korroziyadan mühafizəsi məqsədi ilə yeni tərkibli polimer əsaslı kompozisiya materialları təklif olunmuşdur.




**Cədvəl 3.** Nanodoldurucunun ölçüsünün və istismar mühitinin (neft)kompozisiya materialının fiziki-mexaniki göstəricilərinə təsiri

| S/S | Doldurucunun ölçüsü, nm | Fiziki-mexaniki göstəricilər | | |
|---|---|---|---|---|
| | | Şişmə əması | Dartılmada möhkəmlik həddi | Bərklik |
| K-1 kompozisiya material üçün | | | | |
| 1 | 60 | 2,11 | 87,6 | 29,42 |
| 2 | 80 | 2,66 | 85,7 | 27,05 |
| 3 | 100 | 3,10 | 83,3 | 25,60 |
| 4 | 150 | 3,22 | 81,4 | 23,11 |
| 5 | 200 | 4,16 | 79, 4 | 20,78 |
| K- 2 kompozisiya material üçün | | | | |
| 1 | 60 | 2,35 | 80,27 | 26,24 |
| 2 | 80 | 2,85 | 75,22 | 23,10 |
| 3 | 100 | 3,66 | 71,55 | 21,16 |
| 4 | 150 | 3,92 | 69, 05 | 19, 42 |
| 5 | 200 | 4,56 | 67,27 | 18,20 |
| K- 3 kompozisiya material üçün | | | | |
| 1 | 60 | 3,18 | 68,47 | 20,12 |
| 2 | 80 | 4,06 | 63,10 | 17,25 |
| 3 | 100 | 4,47 | 60,80 | 15,68 |
| 4 | 150 | 5,61 | 55,7 | 13,41 |
| 5 | 200 | 6,05 | 59,82 | 12,78 |

**Cədvəl 4.** Nanodoldurucunun ölçüsünün və istismar mühitinin (neft emulsiyası) kompozisiya materialının fiziki-mexaniki göstəricilərinə təsiri

| S/S | Doldurucunun ölçüsü, nm | Fiziki-mexaniki göstəricilər | | |
|---|---|---|---|---|
| | | Şişmə əması | Dartılmada möhkəmlik həddi | Bərklik |
| K-1 kompozisiya material üçün | | | | |
| 1 | 60 | 3,56 | 73,20 | 22,10 |
| 2 | 80 | 4,18 | 70,05 | 21,20 |
| 3 | 100 | 6,05 | 68,60 | 19,40 |
| K- 2 kompozisiya material üçün | | | | |
| 1 | 60 | 4,78 | 70,15 | 20,15 |
| 2 | 80 | 5,46 | 67,42 | 19,20 |
| 3 | 100 | 7,11 | 62,14 | 17,84 |
| K- 3 kompozisiya material üçün | | | | |
| 1 | 60 | 5,20 | 66,25 | 18,80 |
| 2 | 80 | 6,77 | 62.10 | 17,05 |
| 3 | 100 | 8,05 | 59,50 | 16,10 |

-müəyyən edilmişdir ki, epoksid qətranı və butadiennitril kauçuk əsaslı PÖM bütün hallarda mühitin təsirinə yükcək davamlılığı ilə fərqlənir.
-korroziyadan mühafizəsi məqsədi ilə təklif olunan polimer örtük materialları istismar mühitinindən asılı olaraq ilkin keyfiyyət göstəricilərini itirirlər. Bu səbəbdən onların möhkəmlik və uzunömürlülük xarakteristikalarının qiymətləndirilməsində yeni meyarın (λ – şişmə əmsalı) daxil edilməsi məqsədə uyğun hesab edilir.
-müəyyən edilmişdir ki, PÖM-da fiziki-mexaniki göstəricilər şişmə əmsalı λ-dan asılı olaraq dəyişir. Bu proses mədən suları və neft emulsiyalarında daha yüksək sürətlə baş verir. Ən aşağı göstəricilər (yüksək şişmə əmsalı) qrafitlə doldurulmuş epoksid qətranı əsaslı kompozisiya materialında müşahidə olunmuşdur.
- polimer materiallarda mühit dəyişmələrinin onların mexaniki xassələrinə təsirini nəzərə almaqla qiymətləndirmək üçün riyazi asıllıq müəyyən edilmişdir.

## ƏDƏBİYYAT

1. Габибов И.А. Научно-практические методы эффективного применения полимерных материалов в нефтепромысловом оборудовании. Дисертационная работа на соискание ученой степени доктора технических наук., Баку, АГНА, 1994.
2. Габибов И.А., Бабаев С.Г., Керимов Д.А. Гасанов Я.Г. Основы эффективного применения пластмасс в нефтяном машиностроении: обзорная информация АзНИИНТИ. Баку, 1992. 56с.
3. Головин В.А. Композитные полимерные защитные покрытия для агрессивных сред // Коррозия: материалы, защита.2011, №1, С.1-11.
4. Бабаев С.Г., Кершенбаум В.Я., Габибов И.А. Эволюция качества трибосопряжений нефтегазовой техники. М.: НИНГ, 2018, 516с.

# NANOCOMPOSITE MATERIALS FOR CORROSION PROTECTION OF PIPELINES

**Konul Rustamova**

Engineer, Research Institute "Geotechnological Problems oil, gas and chemistry", Azerbaijan.
E-mail: konul-ayan@mail.ru

## ABSTRACT

Polymer coating materials are used to protect inter-mine pipelines from corrosion. The presented article proposes new polymer-based nanocomposite materials for corrosion protection of pipelines.
**Key words:** polymer-based coating material, nanofiller, swelling coefficient**.**

